QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.Ə.S.)*

Mart 2014 3 (1057)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ




## Novruz bayramı münasibətilə Azərbaycan xalqına təbrik

"Hörmətli həmvətənlər!

Sizi Novruz bayramı münasibətilə ürəkdən təbrik edir, hər birinizə cansağlığı, səadət və bahar əhval-ruhiyyəsi arzulayıram.

Milli varlıq və mənəviyyat xəzinəsi olan Bahar bayramı müdrik əcdadlarımızın bugünkü nəsillərə misilsiz yadigarıdır. Kainatın dəyişməz ahəngi və əbədi qanunları ilə bağlı bu el bayramı zamanın sınaqlarından çıxmış çoxəsrlik mədəniyyətimizin parlaq təcəssümüdür. Novruz ənənələri dəyərlər sistemimizdə müstəsna yer tutmuş, xalqımızın təfəkkürünün ayrılmaz tərkib hissəsinə çevrilmişdir. Cəmiyyət üzvləri arasında qarşılıqlı ünsiyyətə çağırması, səmimiyyəti gücləndirməsi və yüksək əxlaqi keyfiyyətlər formalaşdırması onu ən ali insani xüsusiyyətlərin daşıyıcısı kimi ümumbəşəri mədəni sərvətlər sırasına daxil etmişdir.

Bahar bayramı keçmişimizin ən çətin dövrlərində belə zehinlərdən silinməyib gələcəyə inamımızı sarsılmağa qoymamışdır. Qəlbimizin dərinliklərində kök salaraq milli özünüdərk məfkurəsini yaşatması sayəsində o, ötən əsrin sonlarına doğru Azərbaycanda müstəqil dövlətçilik ideallarının gerçəkləşməsini təmin edən mühüm amillərdəndir. Mənəvi mədəniyyətimizin zənginliklərini özündə toplamış qədim Novruz mərasimlərini qloballaşmanın vüsət aldığı, sürətlə dəyişən dünyada bütün rəngarəngliyi ilə layiqincə qoruyub saxlaması müasir Azərbaycanın tarixi-mədəni və milli-mənəvi irsə bağlılığının rəmzidir.

Yazın gəlişi onun yeniləşdirici ovqatına uyğun, yurdumuzun hər bir guşəsində aparılan genişmiqyaslı quruculuq-abadlıq işləri və insanlarımızın rifahını əsaslı surətdə yaxşılaşdıran çoxsaylı nailiyyətlərlə səciyyələnir. Bizimlə birgə baharı azərbaycançılıq düşüncəsi işığında minlərlə soydaşımız ölkəmizin hüdudlarından uzaqlarda qarşılayırlar. Həmrəyliyimizin rəmzi olaraq bu ümumxalq bayramı qoy hər bir ailəyə bol sevinc və ruzi-bərəkət bəxş eləsin.

Hamınızın əziz Novruz bayramınız mübarək olsun!

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 18 mart 2014-cü il*

# Novruz - əbədiyaşar bayram

## ADPU-da Novruz bayramı şənliyi



Novruz bayramı Azərbaycan xalqının zəngin ictimai-siyasi fikir tarixində, yüksək milli-mənəvi dəyərləri arasında, həmçinin çoxəsrlik dövlətçilik tarixində mühüm yer tutur. Xalqımızın ən gözəl milli bayramı olan Novruz bayramı haqqında "Kitabi-Dədə Qorqud" dastanında, Nizaminin "Siyasətnamə"sində, Xətainin "Bahariyyə"sində, Xəyyamın "Novruznamə"sində müxtəlif məlumatlara rast gəlirik. Novruz-yeni gün, yeni ruzi deməkdir.

Xalqımızın əziz milli bayramı olan Novruz bayramı Günəşin hərəkətinə əsaslanır və dəqiqliyi ilə ilahi məzmun daşıyır. Novruz ən qədim təqvimlərdən biridir. Bu bayramla bizə məlum olan ən qədim təqvim miladdan öncə 505-ci ildə bərpa edilmiş Yeni Avesta təqvimidir. Buna həm də Zərdüşt salnaməsi deyirlər.

Qeyd etdiyimiz kimi, Novruz bayramı xalqımızın dövlətçilik tarixində mühüm əhəmiyyət kəsb edir. 1918-1920-ci illərdə mövcud olmuş Azərbaycan Xalq Cümhuriyyəti Novruzu ilk dəfə olaraq milli bayram kimi rəsmiləşdirmişdi. Lakin Azərbaycanda Sovet hakimiyyətinin qurulması ilə milli bayramların, o cümlədən Novruz bayramının keçirilməsi də qadağan olunmuşdu.

Azərbaycan XX əsrin sonlarında ikinci dəfə öz dövlət müstəqilliyini bərpa etdikdən sonra xalqımızın bir çox adət-ənənələri, bayramları yenidən bərpa edildi. Novruz bayramının qeyd edilməsi rəsmiləşdirildi. Novruz bayramının ölkəmizdə rəsmi qaydada keçirilməsi də ümummilli liderimiz Heydər Əliyevin adı və onun vətənpərvər, millətsevər fəaliyyəti ilə bağlıdır. Ulu öndər Heydər Əliyev xalqımızın çox böyük istəyi və təkidli tələbi ilə respublikamızda yenidən ali siyasi hakimiyyətə qayıtdıqdan sonra bu bayramın dövlət səviyyəsində keçirilməsinin əsası qoyulmuşdur. Ulu öndər Heydər Əliyevin təşəbbüsü ilə 1997-ci ildən Novruz bayramı ölkəmizdə rəsmi qaydada qeyd edilməyə başlanılmışdır. Dahi öndər Heydər Əliyev paytaxtda Novruz bayramı münasibətilə keçirilən xalq şənliklərində iştirak edir, sadə vətəndaşların bayram əhval-ruhiyyəsini, sevincini bölüşürdü. Bu, ulu öndər Heydər Əliyevin Novruz bayramına olan diqqətinin, xüsusi münasibətinin təzahürü idi. Ulu öndər Heydər Əliyevin müdrik dövlətçilik kursunun, strateji inkişaf konsepsiyasının layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin milli-mənəvi dəyərlərimizə, o cümlədən Novruz bayramına olan qayğıkeş münasibəti bu gün eyni ənənəni yaşadır.



Novruz bayramı ulu əcdadlarımızın bizə gözəl yadigarıdır. Azərbaycanda bu bayram çox qədim zamanlardan əsl milli bayram kimi qeyd olunur. Xalqımız yazın gəlişini ilaxır çərşənbələrindən Novruz axşamınadək müxtəlif şənlik və mərasimlərlə qarşılayır. Təbiətin canlanması ilə başlayan hər yeni ilin firavanlıq, xoşbəxtlik və əmin-amanlıq gətirməsini arzulayır. Novruz bayramı həm də xalqımızın gələcəyə olan inam hissini, ürək açıqlığını, qonaqpərvərliyini, mehribançılıq və dostluq duyğularını ifadə edir. Eyni zamanda Novruz bayramında insanın fikri, əməli və istəyi təzələnir, ürəklərdə səmimi insani hisslər, saf duyğular, nəcib arzular oyanır.

Dünya haqqında ilkin təsəvvürlərlə bağlı olan Novruz bayramı eləcə də mənəvi gözəlliyi, mərhəməti və xeyirxahlığı özündə təcəssüm etdirir. Böyük qürur hissi ilə

(Davamı 2-ci səhifədə)

# Novruz - əbədiyaşar bayram

## ADPU-da Novruz bayramı şənliyi

(Əvvəli 1-ci səhifədə)

deyə bilərik ki, tarix boyu heç bir qüvvə Novruz bayramını xalqımızın əlindən almağa, onu insanlarımızın qəlbindən, yaddaşından çıxarmağa nail ola bilməmişdir. Doğrudur, müəyyən dövrlərdə bu bayrama müxtəlif damğalar vurmaq cəhdləri olmuşdur, lakin bütün bu cəhdlər uğursuzluqla nəticələnmişdir. Xalqımız Novruz bayramı ilə bağlı adət-ənənələri göz-bəbəyi kimi qorumuş və onları yaşadaraq, bügünümüzə çatdırmışdır.

Novruz bayramı yalnız Azərbaycanda deyil, eləcə də dünyanın bir çox ölkələrində yaşayan 50 milyondan çox soydaşımız üçün milli birliyimizin həqiqi rəmzinə çevrilmişdir. Elə bu səbəbdən də onlar Bahar bayramını böyük ruh yüksəkliyi ilə qeyd edirlər. Həm Şərq dövlətlərinin, həm də Türk dünyasının böyük bayramı olan Novruz Azərbaycanla yanaşı, Türkiyədə, İranda, Türkmənistanda, Özbəkistanda, Tacikistanda, Əfqanıstanda və dünyanın bir çox ölkələrində qeyd edilir.

Bir faktı da qeyd edək ki, ölkəmizin birinci xanımı, görkəmli ictimai-siyasi xadim, Heydər Əliyev Fondunun prezidenti, YAP-ın Sədr müavini, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın təşəbbüsü, səyləri və bu istiqamətdə apardığı səmərəli əməli fəaliyyəti nəticəsində Novruz bayramı 2009-cu il sentyabr ayının 30-da BMT-nin ali mədəniyyət qurumu olan UNESKO-nun qeyri- maddi mədəni irs siyahısına daxil edilmişdir. 2010-cu il fevral ayının 23-də isə BMT Baş Məclisinin 64-cü sessiyasının qərarı ilə 21 mart rəsmi qaydada Beynəlxalq Novruz Günü elan edilmişdir. Yəni Novruz bayramı artıq 2010-cu ildən başlayaraq dünya səviyyəsində qeyd edilən bir təqvimə çevrilmişdir. Bununla yanaşı,xalqımızın ən qədim və məşhur sənət növlərindən biri olan xalçaçılıq sənəti Mehriban xanım Əliyevanın vətənpərvər fəaliyyəti sayəsində UNESKO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edilmişdir. Bunlardan sonra xalqımızın qədim musiqi aləti olan tar UNESKO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edildi, bu yaxınlarda isə milli rəqslərimiz və çövkən oyunu da bu siyahıya daxil edildi. Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu il mart ayının 18-də keçirilən Novruz şənliyi də bu bayramın yüksək əhval-ruhiyyəsini özündə əks etdirirdi.



ADPU-da keçirilən Novruz şənliyindən öncə universitetin rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov, professor-müəllim heyəti və tələbə kollektivi bayram münasibətilə Mühəndis-pedaqoji və bədii qrafika fakültəsi tələbələrinin əl işlərindən ibarət olan Novruz sərgisi ilə tanış oldular. Sonra universitetin Böyük Akt zalında bayram konserti başladı. Qeyd edək ki, ADPU-da keçirilən bu bayram şənliyinə universitetin tələbələri ilə yanaşı, Azərbaycan Milli Konservatoriyasının, həmçinin Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin əməkdaşları və tələbələri də cəlb edilmişdilər. Novruz bayramının personajları olan Bahar qızın, Kosa və Keçəlin şən zarafataları şənliyə xüsusi ovqat gətirdi. Onu da qeyd edək ki, hər il Novruz bayramı münasibətilə ADPU-nun fakültələri arasında xonça yarışı keçirilir. Builki xonça yarışında Tarix fakültəsi tələbələrinin hazırladıqları xonça I yerə, Pedaqogika və psixologiya fakültəsi tələbələrinin hazırladıqları xonça II yerə, Filologiya fakültəsi tələbələrinin hazırladıqları xonça isə III yerə layiq görüldü. Biologiya fakültəsi tələbələrinin üzərində ulu öndər Heydər Əliyevin əksi olan əl işi isə xüsusi qiymətləndirildi.



ADPU-nun rektoru, professor Yusif Məmmədov universitetin kollektivini Novruz bayramı münasibətilə təbrik etdi, onlara ən xoş, ən səmimi arzularını bildirdi. Rektor Y.Məmmədov eyni zamanda Novruz bayramı münasibətilə keçirilən bu tədbirin ərsəyə gəlməsində xüsusi zəhmətləri olmuş universitet Həmkarlar İttifaqı Komitəsinə, Tələbə Həmkarlar İttifaqı Komitəsinə, Mühəndis -pedaqoji və bədii qrafika fakültəsinin müəllim və tələbələrinə, həmçinin göstərdikləri köməkliyə görə Azərbaycan Milli Konservatoriyasının, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin rəhbərliyinə, tələbə və əməkdaşlarına öz təşəkkürünü bildirdi.

**Gülnar SÜLEYMANOVA,**
**Mətbuat və informasiya şöbəsinin əməkdaşı**



## Xəbərlər

### "Mavi planet, Yer kürəsi və ekosfera" mövzusunda seminar

Bu il mart ayının 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Ekoklub"unun təşəbbüsü ilə Bakı Slavyan Universitetində (BSU) "Mavi planet, Yer kürəsi və ekosfera" mövzusunda seminar keçirilmişdir.

Seminarda Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının (DİA), universitetimizin Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin və BSU-nun tələbələri iştirak etmişlər.

Seminarda mühazirəçi Ramil Rüstəmov Yer kürəsi, planetimizdəki həssas tarazlıqlar və ekosistem, ətraf mühitin problemləri, biotexnologiya, biomühəndisliyin faydaları və yaşadığımız planet haqqında daha geniş təsəvvürlərinin formalaşmasının vacibliyi haqqında danışmışdır.

Onu da qeyd edək ki, bu seminar ADPU, BSU və DİA "Ekoklub"larının əməkdaşlığı əsasında baş tutub. Seminarın keçirilməsində əsas məqsəd universitetlərin klubları arasında əməkdaşlığın yaranması və əlaqələrin genişləndirilməsi olmuşdur.

**Rasim Abdurəhmanov,**
**II kurs magistrantı,**
**"Ekoklub"un sədri**

### Tələbə Gənclər Təşkilatı xanım tələbələrimizi 8 Mart-Beynəlxalq Qadınlar günü münasibəti ilə təbrik edib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatı (TGT) 8 Mart-Beynəlxalq Qadınlar günü münasibəti ilə universitetimizin xanım tələbələrini özünəməxsus tərzdə təbrik edib. Öz fərqli ideyası ilə seçilən TGT ailəsi bu dəfə 200-dən çox stikkerə yazılmış təbrik mesajlarını, yanında kiçik şirniyyat hədiyyəsi ilə bərabər ADPU-nun dəhlizində, auditoriyalarında xanım tələbələrə təqdim etmiş, onlara öz xoş arzularını bildirmişdir.

**"Gənc müəllim"**

# Elmi Şuranın iclasında

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının mart ayının 5-də keçirilən iclasının gündəliyində 7 məsələ dururdu: "İlin müəllimi" müsabiqəsinin yekunları, payız semestrinin imtahan sessiyasının nəticələri, "Dədə Qorqud" və "Koordinasion birləşmələr" elmi-tədqiqat laboratoriyalarının hesabatı, ali təhsil müəssisələrinin bakalavriat və magistratura pilləsində kredit sisteminin tətbiqi ilə tədrisin təşkili, cari məsələlər, kafedralar üzrə professor vəzifəsinə seçkilər.**




***

Elmi Şuranın iclasını ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov açmışdır. Öncə əvvəlki ilin "İlin alimi" müsabiqəsi qaliblərinin diplomları təqdim edilmiş, 2013-cü il üzrə "İlin müəllimi" müsabiqəsinin nəticələri elan olunmuşdur.

Payız semestri imtahan sessiyasının nəticələri ilə əlaqədar məruzəçi, universitetin Tədris işləri üzrə prorektoru, professor M.Cəbrayılovun çıxışından məlum olmuşdur ki, Təhsil Nazirliyi əvvəlki illərdən fərqli olaraq cari tədris ilində ilk dəfə payız semestri imtahan sessiyasının nəticələrini yeni tərtibatda, başqa sözlə, nazirlik tərəfindən tərtib olunmuş suallar cavablandırılmaqla tələb etmişdir.

Professor M.Cəbrayılov da çıxışını elə bu tərtibat əsasında qurmuşdur. Demişdir ki, universitetimizdə payız semestrinin imtahan sessiyasına hazırlıq işinə əslində sentyabr ayından başlanılır. Belə ki, tələbələrin fərdi planı nəzərə alınmaqla hər bir fəndən dərslərə davam edəcək tələbələr müəyyənləşdirilir, kafedralar imtahan keçiriləcək fənlərin hər biri üzrə 700 test sualı tərtib edib testlərin ekspertizası üzrə komissiyaya təhvil verirlər. Testlər ekspertizadan keçdikdən sonra Kompyuter Mərkəzinə təhvil verilir və Kompyuter Mərkəzində uyğun proqrama yerləşdirilir.

Testlər Kompyuter Mərkəzində düz və səhv cavablar qarışdırıldıqdan sonra tələbələrə çatdırılır və suallarda hansı cavabın düz olduğu qeyd edilmir. Kafedralar sualları imtahana düşən fənlərin proqramına uyğun tərtib edərək tələbələrə elan edir.

Fənn müəllimləri tərəfindən sərbəst işlər müəyyənləşdirildikdən sonra tələbələrə verilir. Kafedralarda sərbəst işlərlə və imtahana hazırlıqla bağlı müəllimlərin məsləhət cədvəlləri elan edilir.

İmtahanqabağı kollokviumlar fənn müəllimləri tərəfindən və kompyuter vasitəsilə noyabr-dekabr aylarında keçirilir.

Payız semestrinin imtahan sessiyasına hazırlıqdan bəhs edərkən professor M.Cəbrayılov ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədovun bu xüsusda 2013-cü il dekabr ayının 3-də 3/38 saylı əmri olduğunu söyləmişdir. Demişdir ki, bu əmrlə fakültə dekanlarının və kafedra müdirlərinin həyata keçirəcəkləri vəzifələr müəyyən edilmişdir. Əmrə uyğun olaraq tədris yüklərinin yerinə yetirilməsi semestrin sonunda dekanlıqlar tərəfindən yoxlanılır. Tələbələrin imtahanqabağı balları hesablanır və tədris hissəsinə təhvil verilir. İmtahanlara nəzarət edəcək koordinatorlar və fakültələrin apelyasiya komissiyalarının tərkibi müəyyənləşdirilir. İmtahan sessiyasının mütəşəkkil və şəffaf keçirilməsi üçün fakültə elmi şuraları keçirilir. Şura iclasları kollektiv qarşısında duran vəzifələri müəyyən edir. İmtahanlar əsasən informasiya- kommunikasiya texnologiyalarının (İKT) tətbiqi ilə aparılır. İmtahanların bu yolla götürülməsi şəffaflığın və obyektivliyin təmin edilməsində səmərəli rol oynasa da, təəssüf ki, əksər hallarda tələbənin mövzunu ətraflı öyrənməsi ilə deyil, əzbərçiliyə meyli ilə müşahidə olunur. Bu kimi hallara qarşı mübarizə məqsədi ilə son iki ildə Təhsil Nazirliyinin razılığı ilə universitetimizdə İKT ilə aparılan imtahanlardan "qeyri-kafi", "qənaətbəxş" və "kafi" qiymət alanların qiyməti saxlanılır, "yaxşı", "çox yaxşı" və "əla" qiymət alanlara yazılı imtahan verməklə öz qiymətlərini doğrultmaq təklifi olunur. Bu zaman hətta tələbə yazılı imtahandan "qeyri-kafi" qiymət almış olsa belə, onun əvvəlki qiyməti saxlanılır.

Qiyabi şöbənin V kurslarında və bəzi spesifik fənlərdən isə imtahanlar yazılı aparılır. İmtahan yazılarının yoxlanıldığı auditoriyalarda kameralar vasitəsilə virtual nəzarət həyata keçirilir. Universitet rektorunun 3/267, №-li 15.10.2010-cu il tarixli əmrinə əsasən imtahan və kollokviumlar VTS-TEST şəbəkəsi vasitəsilə həyata keçirilir. Şəbəkənin istismarı üçün 5 qrup yaradılmışdır:

*1. Şəbəkə qrupu. Bu qrup imtahan və kollokviumların İKT vasitəsilə aparılmasının proqram təminatını həyata keçirir;*

*2. Test qrupu. Bu qrup testlərin qəbulu və kompyuterə yerləşdirilməsi ilə məşğul olur;*

*3. Nəzarət qrupu. Bu qrup tələbələrin imtahan auditoriyalarına yerləşdirilməsi ilə məşğul olur;*

*4. İşçi qrup. Bu qrup nəzarətçi koordinatorların imtahan auditoriyalarına bölgüsünü və yazılı imtahanların şifrələnməsi və yoxlanmasını təmin edir;*

*5. Apelyasiya qrupu.*

Daha sonra professor M.Cəbrayılov VTS-TEST şəbəkəsinin fəaliyyəti barədə açıqlama vermişdir. Demişdir ki, payız semestrində universitet üzrə bakalavriat pilləsində əyani şöbədə 6274, qiyabi şöbədə 1842 nəfər, magistratura pilləsində isə əyani şöbədə 574, qiyabi şöbədə 409 nəfər tələbə təhsil almışdır.

İmtahan qiymətindən narazı qalan tələbələr Apelyasiya komissiyasına müraciət edirlər. Apelyasiya komissiyası tələbənin cavabını fakültələrdən dəvət olunan mütəxəssislərin iştirakı ilə araşdırır. Qiymətləndirmədə nöqsan olduqda, aradan qaldırılır və protokollaşdırılır. Payız imtahan sessiyası dövründə bakalavriat pilləsində təhsil alan tələbələr tərəfindən Apelyasiya komissiyasına ümumən 781, o cümlədən əyani şöbədən 765, qiyabi şöbədən isə 16 tələbənin ərizəsi daxil olmuşdur. 181 halda qiymətləndirmə düzgün olmadığı üçün tələbənin qiyməti artırılmışdır.

İmtahanların gedişi haqqında "Xalq qəzeti"ndə, (17 yanvar 2014-cü il), "Kaspi" (22 yanvar 2014-cü il) və "Respublika" (24 yanvar 2014-cü il) qəzetlərində geniş yazılar dərc olunmuşdur.

***

Sonra "Dədə Qorqud" elmi-tədqiqat laboratoriyasının (ETL) müdiri, dosent Ramazan Qafarov Elmi Şuranın üzvlərini laboratoriyanın fəaliyyəti barədə məlumatlandırmışdır. Aydınlıq üçün deyək ki, "Dədə Qorqud" ETL üç problem laboratoriyanın ("Folklor, dialektologiya və etimologiya", "Folklor, etnoqrafiya, mifologiya" və "Pedaqogika, psixologiya, fəlsəfə") bazasında yaradılıb. 2011-ci ilin oktyabrından bu laboratoriyanın müdiri dosent Ramazan Qafarovdur. Laboratoriyada 2 baş elmi işçi, 3 böyük elmi işçi, 5 elmi işçi, 4 kiçik elmi işçi və 8 böyük laborant çalışır. İki nəfərdən savayı ETL əməkdaşlarının hamısı dissertasiya mövzusu üzərində işləyir.

Dosent R.Qafarov respublikamızda "Dədə Qorqud" adı ilə bağlı həyata keçirilən bütün tədbirləri ulu öndər Heydər Əliyevin arzularının həyata keçirilməsi yolunda atılan addım kimi qiymətləndirdi. Rəhbərlik etdiyi ETL-nı respublikamızın bir çox ali təhsil müəssisələrində və hətta AMEA-da fəaliyyət göstərən eyniadlı ETL-lardan həm həcminə, həm də görülən işlərin əhatə dairəsinə görə böyük olduğunu söylədi. Bölmələrdə işlərin yüksək səviyyədə aparılmasında gənc tədqiqatçılardan köməklərini əsirgəməyən professorlar Buludxan Xəlilova, Fərrux Rüstəmova və Paşa Əfəndiyevə və dosent-şair Oqtay Rzaya dərin minnətdarlığını bildirdi. ETL-nın "Dədə Qorqud araşdırmaları" adlı məcmuəsinin nəşr olunduğunu, bu məcmuədə yalnız ADPU əməkdaşlarının deyil, AMEA-nın müvafiq institutlarının və respublikamızın müxtəlif ali məktəblərində çalışan tədqiqatçıların da məqalələrinin çap olunmasından qürurlandığını bildirdi.

Dosent R.Qafarov "Dədə Qorqud" ETL-nın universitetimizin müvafiq kafedraları üçün müəllim kadrları hazırlanmasındakı rolundan danışmağı da unutmadı. Bu gün respublikamızın tanınmış alimlərindən olan Elman Quliyev, Təyyar Cavadov, Yaqub Babayev, Mahmud Allahmanlı və Qüdrət Umudovun ilk dəfə "Dədə Qorqud" ETL-da elmi-tədqiqat işlərinə başladıqlarını xüsusi qeyd etdi. ETL-nın elmi işçisi Tamam Mehrabova ilə baş laborant Mahirə Abdullayevanın hesabat dövründə Azərbaycan dilinin tədrisi metodikası kafedrasına müəllim vəzifəsinə dəyişildiklərini söylədi.

Hasabat dövrü ETL-sının başqa əməkdaşları üçün də yaddaqalan olmuşdur. Belə ki, Xoşbəxt Əliyeva elmi işçi vəzifəsindən baş elmi işçi, Zemfira Abbasova baş laborantlıqdan kiçik elmi işçi vəzifəsinə keçirilmişlər.

Dosent R.Qafarov çıxışında demişdir: "Hesabat dövründə ETL əməkdaşlarının 100 çap vərəqi həcmində əsərləri (monoqrafiya, proqram, məsləhət və məqalələri) çap olunmuşdur. Əməkdaşlarımız respublikamızda və xarici ölkələrdə keçirilən bir sıra beynəlxalq konfransların iştirakçıları olmuşlar. Onlardan iki nəfəri - Əlvan Cəfərov və Bəhram Məmmədov Azərbaycan Respublikasının Prezidenti Yanında Elmin İnkişafı Fondunun layihəsini udaraq, elmi-tədqiqat işlərini davam etdirmək üçün bir ay müddətinə Türkiyə Respublikasına ezam olunmuşlar. Deməliyəm ki, Ə.Cəfərov artıq ezamiyyə müddətini başa vurmuş və hesabatını təqdim etmişdir. B.Məmmədov isə hazırda Türkiyədə elmi ezamiyyətdədir".

Dosent R.Qafarov çıxışının sonunda demişdir: "Ölkə rəhbərliyi tərəfindən "Dədə Qorqud" eposunun araşdırılmasına və təbliğinə həmişə böyük önəm verilmişdir. 2014-cü ildə cənab Azərbaycan Prezidenti cənab İlham Əliyevin "Dədə Qorqud" parkının açılışı və "Dədə Qorqud" filminin çəkilişi ilə bağlı müvafiq fərmanlar imzalaması, "Dədə Qorqud" eposunun elm aləminə bəlli olmasının 200 illiyi ilə əlaqədar tədbirlər planının hazırlanması barədə Nazirlər Kabinetinə tapşırıqlar verməsi bu sırada həyata keçiriləcək diqqətçəkən tədbirlərdəndir. Biz də "Dədə Qorqud" ETL-sı olaraq "Türk eposu düşüncəsi yazılı mənbələrdə" mövzusunda beynəlxalq simpozium keçirmək barədə təşəbbüs qaldırmışıq. Güman ki, bu ilin sonunda simpoziumun keçirilməsinə nail olacağıq".

***

Gündəlikdə olan üçüncü məsələ - "Koordinasion birləşmələr" elmi-tədqiqat laboratoriyasının hesabatı idi. Bu mövzuda laboratoriyanın müdiri, baş elmi işçi, kimya üzrə fəlsəfə doktoru Nazənin Novruzova məruzə etmişdir. N.Novruzova adıçəkilən laboratoriyaya 2011-ci ildən rəhbərlik edir. Məlumat üçün bildirək ki, laboratoriya 1989-cu ildə Təhsil Nazirliyinin müvafiq əmrinə əsasən yaradılmışdır. Burada 5 əməkdaş (2 baş elmi işçi, 1 elmi işçi, 1 kiçik elmi işçi və 1 baş laborant) çalışır. Laboratoriyanın əsas istiqaməti "Analitik kimyanın müasir problemləri", problem isə tərkibində kükürd və azot olan liqantlarla metalların müxtəlif liqantlı kompleksləri və onların müxtəlif obyektlərdə həmin metalların analizində tətbiqi məsələsidir. 2013-cü ildə laboratoriyada iki mövzu işlənmişdir. "Volfram (VI) 2-hidroksil-5-bromtiofenol və 2 - (N, N - dimmetilaminometil) fenolla ekstraksiyalı - fotometrik təyini" (kimya üzrə fəlsəfə doktoru, baş elmi işçi Nazənin Novruzova və elmi işçi Rəna Məmmə-



(Davamı 4-cü səhifədə)

## Elmi Şuranın iclasında

(Əvvəli 3-cü səhifədə)

dova) və "Misin (II) 2-hidroksil-5-bromtiofenol və 2 - (N, N - dimmetilaminometil) fenolla ekstraksiyalı - fotometrik təyini" (elmi işçilər Qeysər Süleymanova və Afət Hacıyevadır).

ETL-nın 2013-cü ildəki fəaliyyəti ilə Elmi Şura üzvlərini məlumatlandıran laboratoriya müdiri N.Novruzova çıxışının sonunda mövzuları işləyərkən qarşıya çıxan çətinliklərin həllində köməklərinə görə Analitik və fiziki kimya kafedrasının müdiri, professor Nailə Verdizadəyə və dosent Əli Zalova minnətdarlığını bildirmişdir.

***

Professor M.Cəbrayılovun Elmi Şuranın müzakirəsinə çıxartdığı məsələlərdən bir də Təhsil Nazirliyinin "Ali təhsil müəssisələrinin bakalavriat və magistratura səviyyələrində kredit sistemi ilə tədrisin təşkili qaydaları" ilə bağlı yeni tədris planlarının tərtibi haqqında sənədinin müzakirəsi oldu.

***

Professor M.Cəbrayılov çıxışını əsasən həmin sənədin 3.2 bəndinin 3.2.2. yarımbəndi üzərində qurdu. Dedi ki, "Ali təhsilin hər iki səviyyəsində əyani təhsilalma forması üzrə tədris ili 40 həftədir. Hər semestr 20 həftədən (o cümlədən, 5 həftə imtahan sessiyası) ibarətdir. Bir semetrə 30 kredit müəyyənləşdirilir. Bir kredit tələbənin auditoriya və auditoriyadankənar 30 saatlıq işinə bərabərdir. Tələbənin 5 (beş) günlük iş rejimində həftəlik auditoriya və auditoriyadankənar ümumi yükünün həcmi 45 saatdır (xüsusi təyinatlı ali təhsil müəssisələri istisna olmaqla). Tələbənin həftəlik işinin həcmi 1,5 kreditdir. Buraxılış işinin magistrlik dissertasiyasının hazırlanmasına və müdafiəsinə, eləcə də buraxılış dövlət və semestr imtahanlarına hazırlığa, imtahanın verilməsinə və təcrübələrin keçirilməsinə ayrılmış hər bir həftə 1,5 kreditə bərabərdir.

Fakültələrin ixtisaslar üzrə tədris planları əsasında bəzi kurslarda dərs prosesi avqust ayına qədər davam edir. Bu isə semestrdə toplanan kreditlərin sayını artırır, eyni zamanda yay semestrinin keçirilməsinə mane olur. Həm də hər semestr ərzində tələbənin 8 nəfərdən çox olmamaqla kredit götürmək imkanı azalır. Odur ki, yeni tədris planları tərtib edilərkən bu cəhətlərin nəzərə alınması zəruridir.

Hazırda istifadədə olan tədris planlarının kredit sistemi ilə tədrisin təşkilinin yeni qaydalarına uyğunlaşdırmalıyıq. Bu zaman yaranan boşluğu doldurmaq üçün sərbəst işlərdən istifadəyə diqqət artırılmalıdır. Bu halda biz yay semestrini normal şəkildə təşkil edə bilərik".

Sonra cari dərs ilinin II yarım ili üçün bəzi ixtisaslar üzrə dərs saatlarının, bəzi ixtisaslar üzrə isə təcrübə saatlarının azaldılması ilə mövcud qüsurların aradan qaldırılması yolları müzakirə olundu.

***

Sonda cari məsələlər müzakirə edilmiş və kafedralar üzrə professor vəzifəsinə seçkilər keçirilmişdir.

**A.İSGƏNDƏROV**

# 31 Mart Soyqırımı bəşəriyyətə qarşı yönəldilmiş qəddar cinayətdir

### ADPU-da 31 Mart – Azərbaycanlıların Soyqırımı Gününə həsr edilmiş dəyirmi masa keçirilib



1918-ci ilin 31 martı Azərbaycan xalqının tarixinə qanlı və faciəli bir səhifə kimi daxil olmuşdur. Belə ki, 1918- ci ilin 31 mart-2 aprel tarixlərində məkrli qonşularımız olan ermənilər öz havadarlarının köməyi ilə xalqımıza qarşı növbəti soyqırımı aktını həyata keçirmişlər. Mənfur ermənilər Azərbaycanın müxtəlif ərazilərində çoxlu sayda soydaşlarımızı vəhşicəsinə qətlə yetirmiş, evəşiklərini yandırmış, onları yurd-yuvalarından didərgin salmışlar. Qeyd edək ki, 1998-ci ildən başlayaraq mart ayının 31-i ölkəmizdə Azərbaycanlıların Soyqırımı Günü kimi qeyd edilir. Bu faciəli tarixi günlə əlaqədar keçirilən müxtəlif tədbirlərdə nankor ermənilərin xalqımıza qarşı törətdikləri vəhşiliklər konkret tarixi faktlar əsasında göstərilir və dünya ictimaiyyətinin diqqəti yenidən bu soyqırımına yönəldilir. Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Heydər Əliyev məktəbinin lektoriyası"nda mart ayının 31-də Azərbaycanlıların Soyqırımı Günü münasibətilə keçirilən dəyirmi masada da bu barədə ətraflı və dolğun çıxışlar edilmiş, tələbə-gənclərə bu soyqırımın dəhşətləri barədə geniş məlumat verilmişdir.



ADPU-da 31 Mart-Azərbaycanlıların Soyqırımı Günü münasibətilə keçirilən tədbir 31 mart soyqırımı zamanı həlak olmuş soydaşlarımızın və eləcə də bütün şəhid soydaşlarımızın xatirələrinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlandı. Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov bildirdi ki, ermənilərin öz havadarlarının köməyi ilə 1918-ci il martın 31-də xalqımıza qarşı törətdikləri vəhşi soyqırımından 96 il keçir. Əslində, ermənilərin xalqımıza qarşı həyata keçirdikləri genosid siyasətinin kökü tarixin dərinliklərinə gedib çıxır. Təxminən 200 il ərzində ermənilər azərbaycanlıların başına olmazın müsibətlər, faciələr gətirmiş, xalqımıza qarşı deportasiya və soyqırımı siyasəti həyata keçirmişlər. Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev bu barədə belə demişdir: «Erməni millətçiləri tərəfindən xalqımıza qarşı həyata keçirilən soyqırımı və təcavüz siyasətinin iki yüz ilə yaxın bir tarixi vardır. Bu mənfur siyasətin məqsədi azərbaycanlıları tarixi torpaqlarından qovmaq, bu ərazilərdə erməni tarixçilərinin və ideoloqlarının uydurduğu «Böyük Ermənistan» dövləti yaratmaq idi. Xalqımızın tarixi kobud şəkildə saxtalaşdırılmış, maddi və mədəniyyət abidələrimiz, toponimlərimiz erməni tarixçiləri və «ideoloqlarının» təcavüzünə məruz qalmışdır». Cənab Prezidentin qeyd etdiyi kimi, məhz ermənilərin etnik təmizləmə siyasəti nəticəsində tarixən əzəli Türk torpaqları sayılan Qərbi Azərbaycanda bu gün bir nəfər də olsun azərbaycanlı qalmamışdır.

Rektor Y.Məmmədov maraqlı və dolğun çıxışında ermənilərin azərbaycanlılara qarşı zaman-zaman həyata keçirdikləri etnik təmizləmə siyasətini özündə əks etdirən maraqlı bir statistikanı da tədbir iştirakçılarının diqqətinə çatdırdı. Rektor qeyd etdi ki, XIX əsrin əvvəllərində müasir Ermənistanın ərazisində 2 mindən çox azərbaycanlı kəndi olmuşdur. Bu gün isə ermənilərin deportasiyası və kütləvi saxtalaşdırma siyasəti nəticəsində həmin yerlərdə nə bir azərbaycanlı qalıb, nə də bir Azərbaycan adı. Gəlin, Çar Rusiyası və Sovet hakimiyyəti illərində Ermənistanın etnik mənzərəsinin necə dəyişdiyini özündə dolğun əks etdirən maraqlı bir statistikaya nəzər yetirək: 1850-ci il - 76% azərbaycanlı, 24% erməni; 1910-cu il - 64% azərbaycanlı, 33% erməni; 1948-ci il - 52% azərbaycanlı, 48% erməni; 1990-cı il - 98% erməni, 2% digər millətlər.

Elmi-tarixi mənbələr göstərir ki, Türkmənçay müqaviləsindən sonra Rusiya imperatoru I Nikolayın 21 mart 1828-ci il tarixli fərmanı ilə İrəvan və Naxçıvan xanlıqları ərazisində «Erməni vilayətinin» yaradıldığı elan edilmiş, 7331 azərbaycanlı və 2369 erməni ailəsinin məskunlaşdığı İrəvan şəhəri də bu vilayətin tərkibinə daxil edilmişdir. Məhz həmin fərmandan sonra 1829-1830-cu illərdə Qafqaza İrandan 40 min, Türkiyədən 84 min 600 erməni köçürülmüş və onlar əsasən Naxçıvan, Qarabağ və İrəvanda yerləşdirilmişdir. Digər tərəfdən, uzun sürən müharibə illərində azərbaycanlıların yaşadıqları yüzlərlə yaşayış məntəqələri məhv edilmiş, minlərlə insan öldürülmüş, on minlərlə insan öz tarixi ata-baba yurdlarını tərk etmişlər. Maraqlı olan başqa bir fakt da var. Belə ki, 1979-cu ilin siyahıyaalınmasına əsasən Ermənistanda 160 min azərbaycanlı (?) və 70 min rus yaşayırdısa, 2001-ci ilin məlumatlarında azərbaycanlıların heç adı da çəkilmir, rusların sayının isə 14 min nəfər olduğu bildirilir.

Ermənilərin xalqımıza qarşı törətdikləri vəhşiliklərin arasında 1918-ci ilin mart hadisələri xüsusi amansızlığı və qəddarlığı ilə seçilir. 1918-ci ilin mart hadisələri zamanı azərbaycanlıların ermənilər tərəfindən kütləvi surətdə qırılması halı baş vermişdir. Belə ki, ermənilər yeni təqvimlə 1918-ci il martın 31-dən aprelin 2-nə (köhnə təqvimlə isə martın 18-dən 21-dək) qədər Bakıda 17000, Şamaxıda isə 8000-dən çox dinc azərbaycanlı sakini xüsusi qəddarlıqla qətlə yetirmişlər. Qətlə yetirilənlərdən 2500 nəfərdən çoxu qadın, 200-ü isə uşaq olmuşdur. Bütövlükdə isə 1918-ci ilin mart hadisələri zamanı ermənilər 50 mindən çox azərbaycanlını öldürmüş, 10 mindən çox insanı isə öz yaşayış yerlərini qoyub qaçmağa məcbur etmişlər. Erməni vandalistləri eləcə də Qubada, Lənkəranda, Dağlıq Qarabağda, Qərbi Azərbaycanda, Naxçıvanda və Azərbaycanın digər bölgələrində 10 minlərlə dinc mülki vətəndaşı qətlə yetirmişlər. Ermənilərin bu vandalist aktının işlənib hazırlanmasının və həyata keçirilməsinin əsas ideoloqu daşnak xislətli Stepan Şaumyan olmuşdur. Özü də bu Sovet tarix elminin uzun müddət iddia etdiyi kimi, sinfi mübarizə və vətəndaş müharibəsi deyil, məhz ermənilərin xalqımıza qarşı törətdiyi əsl soyqırımı olmuşdur. 7 il bundan öncə aşkar edilmiş Quba Soyqırımı Memorial Xatirə Kompleksi də 1918-ci ildə baş vermiş erməni vəhşiliklərinin əyani sübutudur.

Yalnız Türk dünyasının igid oğlu, Qafqaz İslam Ordusunun yaradıcısı və komandanı Nuru Paşanın Azərbaycana gəlişi ermənilərin vəhşi hərəkətlərinin qarşısını ala bilmişdir. Eyni zamanda bir faktı da xüsusi qeyd etmək istəyirəm ki, 1918-ci ilin qanlı 31 mart hadisələri may ayının 28-də Azərbaycan Xalq Cümhuriyyətinin elan edilməsinə gətirib çıxardı. Yəni 31 mart soyqırımı xalqımızın vətənpərvər, millətsevər oğulları qarşısında milli hakimiyyət və milli dövlət qurmağın vacibliyini həyati əhəmiyyətli bir vəzifə kimi qoydu və nəticədə 28 mayda Azərbaycan Xalq Cümhuriyyəti yaradıldı.

Rektor Y.Məmmədov çıxışının bu məqamında dedi: "Digər milli facilərimiz kimi, ermənilərin öz himayədarlarının köməkliyi ilə 1918-ci ilin martında xalqımıza qarşı törətdikləri soyqırımına da yalnız ümummilli liderimiz Heydər Əliyevin təşəbbüsü və birbaşa rəhbərliyi ilə dolğun və hərtərəfli siyasi-hüquqi qiymət verilmişdir. Ulu öndər Heydər Əliyevin 1998-ci il martın 26-da imzaladığı 690 saylı fərmanla 31 Mart dövlət səviyyəsində Azərbaycanlıların Soyqırımı Günü elan edilmişdir. Həmin fərmanla 31 Mart milli faciə günü kimi təqvimimizə daxil olmuşdur. Bunu da xatırlatmağı lazım bilirəm ki, Ulu Öndərimiz həmin sərəncamı imzalayarkən Azərbaycana qarşı beynəlxalq təşkilatlar və dünyanın böyük dövlətləri tərəfindən müəyyən iradlar tutulmuşdu. Yəni həmin qüvvələr Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi ilə bağlı danışıqların getdiyini əsas gətirərək belə mövqedən çıxış edirdilər. Lakin dahi şəxsiyyət Heydər Əliyev onlara əsaslı arqumentlərlə milli tarixlə siyasəti qarışdırmamağı məsləhət görmüşdü".

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirdi ki, 1918-ci il martın 31-də baş vermiş soyqırımının 96-cı ildönümü ilə əlaqədar həm respublikamızda, həm də bir çox xarici ölkələrdə bir sıra tədbirlər həyata keçirilir. Bütün bunların həyata keçirilməsində əsas məqsəd isə ermənilərin iç üzünü açmaq, onların təcavüzkar, terrorçu olduqlarını sübuta yetirmək və Azərbaycan həqiqətlərini dünya ictimaiyyətinə çatdırmaqdan ibarətdir. Yəni informasiya müharibəsini düzgün və səmərəli aparmaq bu işdə mühüm əhəmiyyət kəsb edən amillərdən biridir. Elə buna görə də biz həmişə hər yerdə ermənilərin vandalist əməllərini bütün çılpaqlıqları ilə açıb göstərməli, dünya ictimaiyyətinə və beynəlxalq təşkilatlara bu barədə obyektiv məlumatların çatdırılması üçün bütün imkanlarımızdan istifadə etməliyik. Başda ölkə Prezidenti cənab İlham Əliyev olmaqla Azərbaycan dövləti bu vacib istiqamətdə bütün tədbirləri həyata keçirir. Ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, YAP-ın Sədr müavini Mehriban Əliyevanın bu vacib istiqamətdə gerçəkləşdirdiyi səmərəli fəaliyyəti xüsusi qeyd edilməlidir. Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla xanım Əliyevanın təşəbbüsü və rəhbərliyi ilə həyata keçirilən "Xocalıya ədalət!" beynəlxalq məlumatlandırma kampaniyası da Azərbaycan həqiqətlərinin dünya ictimaiyyətinə çatdırılması baxımından böyük əhəmiyyət kəsb edir. Eyni zamanda biz də bir Azərbaycan vətəndaşı olaraq tarix boyu ermənilərin xalqımıza qarşı törətdikləri vəhşilikləri, soyqırımlarını Azərbaycan gəncliyinə konkret faktlarla, sübutlarla göstərməliyik. Unutqanlığımızdan əl çəkməli, ermənilərin tarix boyu bizə düşmən kəsildiklərini yaddan çıxart-

(Davamı 5-ci səhifədə)

## 31 Mart Soyqırımı bəşəriyyətə qarşı yönəldilmiş qəddar cinayətdir

(Əvvəli 4-cü səhifədə)

mamalıyıq. Tələbə-gəncləri milli ruhda tərbiyə etməli, onlara ermənilərlə bağlı bütün tarixi həqiqətləri çatdırmalıyıq. Özü də bu istiqamətdə iş apararkən biz tarixi keçmişimizlə bu günümüzü əlaqələndirməyi bacarmalıyıq. Hazırda Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin həlli ilə bağlı dinc sülh danışıqları davam edir. Azərbaycan Prezidenti cənab İlham Əliyevin qeyd etdiyi kimi, yalnız Ermənistanın qeyri-konstruktiv mövqeyi, eləcə də beynəlxalq təşkilatların münaqişənin həllinə ikili standartlarla yanaşmaları üzündən problemin həlli ləngiyir. Eyni zamanda, riyakar ermənilər həmişə olduğu kimi, yenə də öz çirkin məqsədlərinə çatmaq üçün tarixi həqiqətləri təhrif edir, beynəlxalq ictimaiyyətin diqqətini əsl həqiqətdən azdırmağa, yayındırmağa çalışırlar.

Dövlət başçımız cənab İlham Əliyev bütün mötəbər toplantılarda birmənalı şəkildə qeyd edib ki, Qarabağ münaqişəsi yalnız xalqımızın milli maraqları çərçivəsində, beynəlxalq hüququn norma və prinsipləri əsasında həll ediləcəkdir. Azərbaycan öz ərazisində "ikinci erməni dövləti"nin yaradılmasına əsla imkan verməyəcəkdir. Buna müstəqil Azərbaycan dövlətinin günü-gündən artan siyasi nüfuzu, iqtisadi və hərbi qüdrəti imkan verir. Azərbaycan hazırda regionun aparıcı lider dövləti, mühüm regional və transmilli layihələrin uğurla həyata keçirildiyi bir ölkədir. Azərbaycan öz enerji təhlükəsizliyini təmin etməklə yanaşı, Avropanın da enerji ilə təmin olunmasında fəal iştirak edir. Dövlətimiz müstəqil xarici siyasət yürüdür. Ermənistan isə bütün beynəlxalq layihələrdən kənarda qalaraq, təcrid olunmuş bir vəziyyətdə yaşayır. Ermənistanda siyasi və iqtisadi böhran günü-gündən dərinləşir. Ermənistan faktiki olaraq bəzi böyük dövlətlərdən asılı vəziyyətdədir. Əslində o, forpost vəziyyətində yaşayan bu ölkədir. Bir sözlə, Azərbaycan bütün göstəricilərinə görə Ermənistanı çox geridə qoyub və bu Dağlıq Qarabağ probleminin məhz bizim xeyrimizə həll ediləcəyinə etibarlı zəmin yaradan ən vacib amillərdən biridir.

Tədbirdə Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Mais Əmrahov "Qanla yazılmış yaddaş" adlı məruzə ilə çıxış etmişdir. Professor Mais Əmrahovun hərtərəfli və dolğun məruzəsində ermənilərin 1918-ci ilin martında xalqımıza qarşı törətdiyi soyqırımı konkret tarixi faktlar əsasında öz əksini tapdı. (Professor Mais Əmrahovun məruzəsinin mətnini təqdim edirik).

Tədbirdə çıxış edən Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev və həmin kafedranın dosenti Səmayə Mustafayeva ermənilərin tarixən xalqımıza qəddar düşmən kəsildiklərini və erməni vəhşiliklərinin dünya ictimaiyyətinə çatdırılmasının vacibliyini xüsusi qeyd etdilər.

**Mənsur İBRAHİMLİ,**
**Mətbuat və informasiya şöbəsinin müdiri, Azərbaycan Jurnalistlər Birliyinin üzvü**

# Qanla yazılmış yaddaş

**XX əsrin sonlarında müstəqilliyin yenidən əldə etmiş xalqımızın mübarizə tarixində kəşməkəşli səhifələr çox olmuşdur. Təəssüf ki, yaşadığımız sovet ictimai quruluşunun «sosialist gerçəkliyi» nin qadağaları bizə öz mücadilə yolumuza aydın nəzər salmağa uzun onilliklər boyu imkan verməmişdir. Nə yaxşı ki, nəhayət, belə imkan yaranıb. Öz keçmişini, dünənini bilməyən xalqın bu günü də, gələcəyi də zamanın sınaqları qarşısında ciddi təhükəyə məruz qala bilər. Odur ki, dünəninmizi öyrənmək, başımıza gələnləri, daha doğrusu gətirilənləri doğru-düzgün dərk etmək bugünkü istiqlaliyyətimizi qoruyub-saxlamaq yoluda bizə çox gərəklidir. Tarixi dönəmlərdə baş vermiş ictimai-siyasi prosesləri təhlil edib onlardan düzgün nəticə çıxarmaq, buraxılan səhvləri bir daha təkrarlamamaq, sabahımıza gedən yolun etibarlılığına ən güclü zəmanət və təminatdır.**

Azərbaycan öz müstəqilliyinin 23-ci ilini yaşayır. Ötən 23 ildə Azərbaycan Respublikası əsrlərə bərabər yol keçmiş, dövlətçiliyin möhkəmləndirilməsi yolunda ciddi addımlar atılmışdır. Azərbaycan bu gün beynəlxalq birliyin bərabərhüquqlu üzvüdür, etibarlı tərəfdaşdır. Ölkəmizdə yaranmış sabitlik, həyatımızın ayrı-ayrı sahələrindəki inkişafın nəticəsidir ki, biz tariximizin uzun illər gizli saxlanılan, saxtalaşdırılan və təhrif edilən dövr və hadisələrinin obyektiv mənzərəsini yaratmaq imkanı əldə etmişik. Belə hadisələrdən biri də, ümummilli lider Heydər Əliyevin qətiyyəti nəticəsində artıq öz siyasi və hüquq qiymətini almış və hər il qeyd etdiyimiz 31 Mart-Azərbaycanlıların Soyqırımı Günüdür. Elə Ulu Öndərin böyüklüyü ondadır ki, o özündə cəsarət taparaq xalqın qan yaddaşında yaşayan iki tarixi faciə haqqında - «1948-1953-cü illərdə azərbaycanlıların Ermənistan SSR ərzisindəki tarixi-etnik torpaqlardan deportasiyası haqqında» və «Azərbaycanlıların soyqırımı haqqında» fərmanlar verdi. 31 Mart Azərbaycanlıların Soyqırımı Günü elan edildi. Beləliklə, əsil həqiqəti dünya ictimaiyyətinə çatdırmaq, soyqırımı aparıldığını, Ermənistan SSR ərazisinin qədim Azərbaycan torpaqları olduğunu rəsmiləşdirməklə yanaşı, xalqımızın tarixinə «ağ ləkələr» kimi düşmüş, əslində isə qanlı faciəvi hadisələr kimi yaddaşlara köçmüş bu səhifələri düzgün və obyektiv yazmaq üçün şərait yarandı. Bəli, zamanın üzərinə kölgə saldığı səhifələr işıqlanmağa, qaranlıq mətləblər aşkarlanmağa başladı.

Fərmanda göstərilir ki, son iki əsrdə Qafqazda azərbaycanlılara qarşı məqsədyönlü şəkildə həyata keçirilən etnik təmizləmə və soyqırımı siyasəti nəticəsində xalqımız ağır məhrumiyyətlərə, milli faciə və məşəqqətlərə məruz qalmışdır.Bu sənəddə ilk dəfə olaraq XX əsrdə mərhələlərlə 1905-1907, 1918-1920, 1948-1953, 1988-1993-cü illərdə azərbaycanlılara qarşı həyata keçirilmiş qırğınların rəsmi xronikası verilir və azərbaycanlı əhaliyə qarşı Zaqafqaziyada düşmənçilik siyasətinin kökləri açılır. Fərmanda qeyd edildiyi kimi, indi «…qarşımızda duran əsas vəzifələrdən biri də, son əsrlərdə xalqımıza qarşı həyata keçirilən soyqırımı haqqında indiki və gələcək nəsillərdə möhkəm milli yaddaş formalaşdırmaq, bu faciələrə bütün dünyada siyasi və hüquqi qiymət verilməsinə nail olmaq, onun ağır nəticələrinin aradan qaldırılmasına və bir daha belə halların təkrar olunmamasına çalışmaqdır».

Azərbaycanlılara qarşı ermənilərin soyqırımı əsrin əvvəllərindən başlamışdır. 1905 -1907-ci illərdə Bakıda baş verən qırğın





polis və ordunun gözləri qarşısında baş vermişdir. M.S.Ordubadi «Qanlı illər» əsərində bu hadisədən bəhs edərək yazırdı: «… süni və çoxdan bəri millətin zatına qondarılmış iğtişaş bombası partladı və bütün Qafqaz aləmi bu bombanın təsiri şiddətindən yanıb yaxıldı». Böyük ədib öz-özünə «o partlayıcı maddə həqiqət bomba idimi» deyə sual verir və cavabında deyir: «Bəli, bu bomba baş verən Bakı faciəsidir ki, bütün Qafqaza buradan atəş açıldı» və iki il davam edən erməni-azərbaycanlı qırğını başladı. Bakıdan sonra qırğın İrəvan, Naxçıvan, Şuşa, Cəbrayıl və Qaryagini (indiki Füzuli), digər bölgələri əhatə etmiş, qırğına Çar hökuməti rəvac vermişdi. Böyük Cəfər Cabbarlı "1905-ci ildə" əsərində bu faciənin səbəbkarını ifadə edərək yazırdı «… işıqları söndürün, atan kazaklardır».

Dünya xalqları arasında öz nəfsləri ilə seçilən, gözü doymayan ermənilərin iştahası həmişə böyük olmuş, yaranmış tarixi şəraitdən istifadə etməyə səy göstərmişlər. F.Kərimzadə«Güney uğ-runda mübarizə (1917-1921)» kitabında yazırdı ki, bütün erməni-lə-rin katalikosu V Kevorq 1914-cü il avqustun 5-də Qafqaz canişinə məktub göndərərək ondan erməni məsələsini yaddan çıxarmamağı xa-hiş etmişdi. Çar II Nikolay isə cavabında "ermənilər ən par-laq gələcək gözləyir"-demişdi.

Rusiya imperatoru 1914-cü il noyabrın 21-də Fransanın Rusi-ya-dakı səfiri M.Polsoloqla görüşündə də erməni məsələləsini nəzərə alacağını, onlar üçün müstəqil dövlət yaradacağını bildirmişdi. II Nikolay 1914-cü ilin noyabrında Tiflisdə olarkən daşnak-lar-dan S.Arutunyan və A.-Xatisiyanın başçılıq etdiyi nümayəndə heyəti onun qəbulunda olmuş və onlar II Nikolaya «… həyatlarını, əmlaklarını böyük taxt-tacın yolunda qurban verməyə hazır olduqlarını» bildirmişlər.

Ermənilər və onların havadarları dindaşlarının köməyi ilə məqsədinə nail oldular. 1813 və 1828-ci il müqavilələrinə qədər Azərbaycan ərazisi təxminən 410 min kv. km. idi. 1813-1828-ci illərdə Azərbaycan ərazilərinin bir hissəsi-sahəsi 280 min kv.km. Cənubi Azərbaycan ərazisi İran əsarəti altına düşmüşdür. Rusiya əsarəti altına düşən ərazi isə 130 min kv. km olmuşdur.

1918-ci ildə Rusiyanın təzyiqi ilə 9 min kv. km ərazisi olan İrəvan xanlığı ermənilərə verilmiş, Rusiyanın əsarəti altında keçən və sahəsi 7 min kv. km olan ərazidə Dərbənd xanlığı yaradılmışdır.

1918-1920-ci illərdə Azərbaycan Xalq Cümhuriyyətinin qurulduğu ərazinin sahəsi 114 min kv. km olmuşdur. 1920-ci ildə Azərbaycan Xalq Cümhuriyyətini işğal edən Rusiya sovet imperiyası Azərbaycan ərazilərini bölüşdürərək Zəngəzur, Göyçə, Şərur, Dərələyəz və Dilicanı ermənilərin, Borçalı ərazisini isə gürcülərin nəzarətinə vermişdir.

Ümumiyyətlə, Azərbaycanın XI Ordunun iş-ğa-lından sonra 29.338,2 kv. km ərazisi Ermənistan və Gür-cüstana verilmişdir. Bu ərazilərdən İrəvan (qalan hissəsi) (3.100, 2 kv. km), Zəngəzur (çox hissəsi) (5.115, 4 kv. km), Qazax (2.980, 3 kv.km), Dərələyəz (1.583, 8 kv.km) Ermənistana, Borçalı (bir hissəsi) (5.161,4 kv.km.), Sıqnax (6.832, 6 kv. km) və bir sıra başqa ərazilər (4.564, 6 kv. km.) Gürcüstana verilmişdir. 1920-1991- ci illərdə SSRİ əsarəti altında qalmış Azərbaycan Sovet Sosialist Respublikasının ərazisi 86,6 min kv. km olmuşdur.- Beləliklə, Azərbaycan torpaqları zaman-zaman bir-birindən ayrılmış, bu ayrılıq təkcə torpaqlarımızı deyil, həm də soydaşlarımızı bir-birinə dəmir çəpərlər arxasından baxmağa məcbur etmişdir. Sanki heç nə olmamış kimi,

Atıb imzasını hər kəs varağa,
Əyləşir sakitcə keçib yerinə.
Eynəkli cənabla, təsbehli ağa,
Qalxıb əl də verir biri-birinə.

Onların birləşən bu əlləriylə
Ayrılır ikiyə bir el, bir Vətən.
Axıdıb gözündən yaş gilə-gilə,
Bu dəhşətli hala nə deyir Vətən?
Bir deyən olmadı, durun, ağalar!
Axı bu ölkənin öz sahibi var.
Siz nə yazırsınız, bayaqdan bəri-
Bəs hanı bu yurdun öz sahibləri?

Bəs hanı həqiqət, bəs hanı qanun?
Qocadır bu yurdun tarixi, yaşı.
Bəs hanı köksünə sərhəd qoyduğun,
Bir vahid ölkənin iki qardaşı? -

deyən ustad Bəxtiyar Vahabzadənin təbirincə desək:

Necə ayırdınız dırnağı ətdən,
Ürəyi bədəndən, canı cəsəddən?
Axı kim bu haqqı vermişdir Sizə,
Sizi kim çağırmış Vətənimizə?
Ağalar bilmədi birdir bu torpaq
Təbriz də, Bakı da Azərbaycandır.
Bir elin ruhunu, dilini ancaq
Kağızlar üstündə bölmək asandır.
Böl, kağız üstündə, böl, gecə-gündüz,
Torpağın üstünə dirəklər də düz.

Gücünü, əzmini tök də meydana,
Qoşundan, silahdan sədd çək hər yana.
Torpağı ikiyə bölərsən, ancaq
Çətindir bədəni candan ayırmaq!

Azərbaycanlılara qarşı növbəti məqsədyönlü soyqırımı 1918-ci ilin 30-31 mart və aprelin 1-də (köhnə stillə martın 17-də, Novruz bayramı ərəfəsində) törədildi. Uzun illər vətəndaş müharibəsi kimi qiymətləndirilən mart hadisələri həm də ermənipərəst Bakı Sovetinin sonu oldu. Məlum olduğu kimi, 1918-ci ilin əvvəllərində Bakı ilə Tiflis arasında dəmir yolunun qapanması nəticəsində Qafqaz cəbhəsinə yollanan Qərb və İran cəbhəsindən gələn bir neçə min silahlı er-məni əsgərləri Bakıya toplaşmışdı. Bu vaxt "Daşnaksütyun" partiyasının da Bakıda minə yaxın silahlı adamı var idi. «Müsavat» ın isə silahı olmadığına görə Bakı və ətraf kəndlərin əhalisi silahsız qalmışdı. Üstəlik H.Z.Tağıyevin oğlu Məhəmməd Tağıyevin cənazəsini Lənkərandan Ba-kı-ya gətirən «Evelina» gəmisi ilə Bakıya gəlmiş Azər-baycan Milli Ordusunun hərbiçiləri bolşevik-daşnak ordusu tərəfindən zorakılıqla tərksilah edildi. Bolşevik-daşnak birləşməsinin bu addımı bir daha gös-tərdi ki, onlar silahlı münaqişə üçün bəhanə axtarır, «Daşnaksütyun» partiyası və erməni Milli Şurası öz mənfur siyasətini həyata keçirmək üçün məqam gözləyirdi. 1918-ci ilin martın 29-da Lənkərana getmək istəyən paroxodun saxlanılması və tərksilah edilməsi milli qırğın üçün bəhanə oldu.

*(Davamı gələn sayımızda)*

**Mais ƏMRAH,**
**tarix üzrə elmlər doktoru, professor**

# Türk dünyasının böyük zəfəri




Bütün Türk dünyasının tarixinə böyük qəhrəmanlıq və hərbi şücaət salnaməsi kimi daxil olmuş Çanaqqala savaşından 99 il keçir. Qəhrəman Türk xalqının bu böyük tarixi qələbəsi münasibətilə bu il mart ayının 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu ali məktəbdə təhsil alan türkiyəli tələbələrin İdarə Heyətinin təşəbbüsü, təşkilatçılığı və fəal iştirakı ilə "18 Mart Çanaqqala zəfəri və şəhidlərimizi anma" adlı tədbir keçirilmişdir.

Tədbirdə ilk olaraq Çanaqqala savaşında, eləcə də Türkiyənin və Azərbaycanın ərazi bütövlüyü və dövlət müstəqilliyi uğrunda həlak olmuş bütün şəhidlərimizin əziz xatirələri bir dəqiqəlik sükutla yad edilmiş, Azərbaycanın və Türkiyənin dövlət himnləri səsləndirilmişdir.

Mərasimi giriş sözü ilə açan ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev bildirmişdir ki, bu bizim Pedaqoji Universitet olaraq Çanaqqala zəfərinə həsr etdiyimiz üçüncü toplantıdır və bizim bu tədbirin ərsəyə gəlməsində əvvəllər olduğu kimi, yenə də universitetimizdə təhsil alan türkiyəli tələbələr xüsusi fəallıq nümayiş etdirmişlər. Buna görə onlara universitetin rəhbərliyi adından öz təşəkkürümüzü bildiririk.

Professor Rafiq Baxşəliyev çıxışına davam edərək bildirmişdir ki, böyük Türk xalqının çox çətin və mürəkkəb vəziyyətdə qazandığı Çanaqqala zəfəri haqqında danışmaq üçün ilk növbədə, həmin dövrün tarixi-siyasi şəraitinə diqqət yetirmək vacibdir. Çanaqqala döyüşü Birinci Dünya müharibəsi illərində (1914-1918), daha dəqiq desək, 1915-1916-cı illərdə Osmanlı dövləti ilə İttifaq dövlətləri (İngiltərə, Fransa və s.) arasında dənizdə və quruda aparılan nəhəng bir döyüş olmuşdur. Həmin dövrdə İttifaq dövlətləri Osmanlı dövlətinin paytaxtı İstanbulu işğal edərək boğazları ələ keçirmək və bununla da Rusiya üçün etibarlı bir ticarət və hərbi yol açmaq istəyirdilər. Eyni zamanda onlar Almaniyanın müttəfiqlərindən biri olan Osmanlını zəiflətmək məqsədilə Çanaqqalanı hədəf seçmişdilər. Çünki Çanaqqalanın işğal edilməsi bütünlükdə Osmanlı dövlətinin tamamilə məhv edilməsi demək idi. Yəni bu döyüş faktiki olaraq Osmanlı dövləti üçün bir ölüm-dirim məsələsi idi. Lakin İttifaq dövlətlərinin qoşunlarının çoxsaylı hücumları uğursuzluqla nəticələnmişdir. Belə ki, Antantaya üzv olan dövlətlərin müasir döyüş texnikası ilə təchiz edilmiş böyük sayda canlı qüvvəsi çoxsaylı hücumlara baxmayaraq, qəhrəman Türk əsgəri tərəfindən geri otuzdurulmuşldur. Hər iki tərəf çox böyük itkilər vermişdir. Məşhur Çanaqqala döyüşü məhv olma vəziyyətinə gətirilmiş Osmanlı dövlətinin bir möhtəşəm qələbəsi kimi tarixə düşmüş, hər bir vətəndaşın xatirəsində qalmışdır. Digər tərəfdən, Çanaqqala zəfəri Türk xalqının, Türk millətinin tarixin ən çətin və mürəkkəb dövrlərində öz gücünü, iradəsini ortaya qoyaraq nələr edə biləcəyini bütün dünyaya göstərmişdir. Bu savaş həm də Türk Qurtuluş Döyüşünə böyük təsir göstərmişdir. Məhz buna görə Türkiyə Respublikası qurulduqdan sonra ingilis və fransız donanmalarının geri çəkilməyə məcbur edildiyi 18 mart tarixi Çanaqqala Şəhidlərini Xatırlama Günü olaraq elan edilmişdir. Düşmən tərəfi olan Antanta birliyi üçünsə bu döyüş hərbi bacarıqsızlıq və fəlakət simvolu olaraq qəbul edilmişdir. Heç də təsadüfi deyil ki, Türk xalqının dünya şöhrətli hərbi-siyasi xadimi, çağdaş Türkiyə Respublikasının yaradıcısı və qurucusu, ilk prezidenti Mustafa Kamal Atatürkə Misirin o zamankı siyasi xadimlərindən biri «Biz də azad olmaq istəyirik, necə edək ki, buna nail olaq? Bizə nə məsləhət verərdiniz?» sualı ilə müraciət edərkən böyük Atatürk ona «İlk öncə ölmək üçün 300 min insanınız olmalıdır, sonrasını mən sizə deyərəm» - cavabını vermişdir.



Bu gün bütün Türk dünyasının parlaq hərbi-siyasi istedadından, məharətindən böyük qürur və fəxr duyduğu Mustafa Kamal Atatürk bu döyüşdə öz üzərinə düşən hərbi vəzifələri layiqincə yerinə yetirmşdir. Mübaliğəsiz deyə bilərik ki, böyük Atatürkün öz əsgərlərinə «Mən sizə vuruşmağı əmr etmirəm, ölməyi əmr edirəm!» çağırışı Çanaqqala savaşının gedişinə və nəticəsinə böyük təsir göstərmişdir. Mustafa Kamal Atatürk elə döyüşlərin ilk günlərindən öz parlaq sərkərdəlik qabiliyyətini və hərbi istedadını üzə çıxararaq məşhurlaşmışdır. Bu fakt həm də Mustafa Kamal Atatürkün Türk xalqının milli lideri kimi ortaya çıxmasına həlledici təsir göstərmişdir.

Anım mərasimində çıxış edən Türkiyənin Azərbaycandakı təhsil müşavirinin müavini İdris Gobutoğlu bu tədbirin keçirilməsinə verdiyi hərtərəfli dəstəyə görə ADPU-nun rəhbərliyinə öz təşəkkürünü bildirmişdir. İdris Gobutoğlu eyni zamanda tələbə-gənclərə bundan sonra da Vətən, xalq, dövlət, bayraq kimi yüksək dəyərlər uğrunda mübariz olmağı tövsiyə etmişdir.




Tədbirdə ADPU-nun Kimya fakültəsinin tələbəsi Arifə Puçaxova "Çanaqqala zəfəri" adlı məqaləsini, Kimya fakültəsinin tələbəsi Lalə Rəsulzadə isə "Dur yolçu!" şeirini oxumuşlar. Türkiyəli tələbə Muhammed Halid Özenin universitetimizin Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, Əcnəbi tələbələrin işi üzrə fakültənin dekanı, dosent Nurəddin Uluxanlı, Pedaqogika və psixologiya fakültəsinin dekanı, dosent Şəhla Əliyeva, Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti Nazimə Rüstəmovanın maraqlı müsahibələri əsasında hazırladığı videoçarx, Hazırlıq fakültəsinin tələbəsi Hacer Irkının "Çanaqqala tarixi" adlı çıxışı, Hazırlıq fakültəsinin tələbəsi Büşra Ekerin "Çanaqqala şəhidlərinə" şeiri, Hazırlıq fakültəsinin tələbəsi Ali Arıkmertin "Çanaqqala məhşəri" şeiri, Kimya fakültəsinin tələbəsi Əzizə Quliyevanın "Çanaqqala keçilməz" şeiri və Hazırlıq fakültəsinin tələbəsi Yusuf Yılmazın "Bu Vətən kimin?" şeiri tədbir iştirakçıları tərəfindən rəğbətlə qarşılanmışdır.

Tədbirdə Çanaqqala savaşını əks etdirən videoçarx, həmçinin "Çanaqqala mahnısı" adlı klip nümayiş olunmuşdur.

**Könül MƏMMƏDOVA,**
**Tarix fakültəsinin II kursunun 203-cü qrup tələbəsi**





# I Beynəlxalq Türk Dünyası Araşdırmaları Simpoziumu

Mart ayının 18-21 tarixlərində Türkiyə Respublikasının Niğde şəhərində I Beynəlxalq Türk Dünyası Araşdırmaları Simpoziumu keçirilmişdir. Türkiyənin Niğde Universiteti, Qazaxıstanın Qazax Dövlət Pedaqoji Universiteti və Başqırdıstanın M.Akmulla Dövlət Pedaqoji Universitetinin birgə təşkilatçılığı ilə keçirilən simpozium zamanı dünyanın müxtəlif ölkələrində yaşayan türklər bir araya gəlmişdilər. Simpoziumda türkdilli dövlətlərlə yanaşı, digər dövlətlərdə yaşayan türklər və türkoloqlar da iştirak edirdilər. Rusiya, Yaponiya, Çin, ABŞ, Almaniya, İtaliya, İran, Albaniya, Monqolustan, Kosova, Ukrayna, Əfqanıstan, Makedoniya və digər dövlətlərdən dəvət olunmuş türkoloqlar və tədqiqatçılar bu simpoziumda iştirak edirdilər.

I Beynəlxalq Türk Dünyası Araşdırmaları Simpoziumu Türkiyənin himninin səsləndirilməsi ilə başladı. Tədbiri giriş sözü ilə açan Niğde Universitetinin rektoru, professor Adnan Görür qonaqları salamlayaraq konfrans iştirakçılarına uğurlar arzuladı. Professor Adnan Görür öz çıxışı zamanı I Beynəlxalq Türk Dünyası Araşdırmaları Simpoziumunun keçirilmə tarixinin təsadüfi olaraq seçilmədiyini vurğulayaraq, hər ilin 18 martın Türk dünyası tarixində şanlı Çanaqqala zəfərinin qeyd olunduğu bir tarix olduğunu vurğuladı. Eləcə də professor Adnan Görür konfransın türkdilli dövlətlərin geniş miqyasda qeyd etdiyi Novruz bayramı ərəfəsinə təsadüf etməsini qonaqların diqqətinə çatdırdı. Daha sonra Qazax Dövlət Pedaqoji Universitetinin rektoru, professor Dinar Nöketeyeva çıxış etdi. Professor Dinar Nöketeyeva qonaqları təbrik etdikdən sonra hər kəsə uğurlar arzuladı. Sonra isə Başqırdıstanın M.Akmulla Dövlət Pedaqoji Universitetinin rektoru, pofessor Rayil Asadulin çıxış edərək qonaqlara, tədbir iştirakçılarına uğurlar arzuladı. Təbrik çıxışlarından sonra simpoziuma dəvət olunan qonaqlar öz xatirə hədiyyələrini təqdim etdilər. Açılış mərasiminin sonunda isə qonaqlarla birlikdə xatirə şəkli çəkildi.

Təbdirin açılış mərasimi başa çatdıqdan sonra simpozium bölmə iclaslarında öz işini davam etdirdi. Simpozium zamanı ümumilikdə təxminən 90-a yaxın bölmə iclasları keçirilmiş və 400-ə qədər məruzə dinlənilmişdir.

I Beynəlxalq Türk Dünyası Araşdırmaları Simpoziumunda Azərbaycanı Naxçıvandan, Gəncədən, Sumqayıtdan, Azərbaycan Milli Elmlər Akademiyasından müxtəlif tədqiqatçılar təmsil etmişlər. Adıçəkilən simpoziumda ADPU-nu universitetimizin "Türk araşdırmaları" elmi-tədqiqat laboratoriyasının elmi işçiləri Leyla Kərimova və Aytən Abbasova təmsil etmişlər. Simpoziuma dəvət olunan tədqiqatçı-türkoloqlar sırasında yer alan Aytən Abbasova və Leyla Kərimova müxtəlif mövzularda məruzə ilə çıxış etmişlər. Aytən Abbasova "Cengiz Dağcı romanlarının mövzu və ideya istiqamətləri", Leyla Kərimova isə "Mehmet Akif Ersoyun yaradıcılığında sosial problemlərin bədii əksi" adlı məruzələrlə çıxış etmişdir. Onların hər ikisi öz çıxışı zamanı bir sıra mühüm məqamlara toxunmuş, məruzələri tədbir iştirakçıları və qonaqlar tərəfindən rəğbətlə qarşılanmışdır. Leyla Kərimova və Aytən Abbasovanın çıxışları bəyənilərək hər ikisi fəxri fərmanla təltif edilmişlər. Onu da qeyd edək ki, həm Aytən Abbasova, həm də Leyla Kərimovanın çıxışları bəyənildiyi üçün onlar Qazaxıstan Respublikasında keçiriləcək digər bir beynəlxalq simpoziuma dəvət olunmuşlar.



Təqdirəlayiq haldır ki, I Beynəlxalq Türk Dünyası Simpoziumu zamanı hər bir bölmə iclası Türk dünyasının böyük şəxsiyyətlərinin adı ilə bağlı olmuşdur. Simpozium günlərində qonaqlara türk təsəvvüf musiqisi təqdim olunmuş, eləcə də digər türk xalqlarının milli musiqiləri, rəqsləri nümayiş etdirilmişdir. Tədbirin sonuncu günü isə simpozium iştirakçıları Türkiyənin müxtəlif tarixi memarlıq komplekslə ri ilə tanış olmuşlar. Həmçinin simpozium Novruz bayramına təsadüf etdiyindən, qonaqlar üçün Novruz süfrəsi də təşkil olunmuşdur.

Bütün Türk dünyasının bir araya gəldiyi I Beynəlxalq Türk Dünyası Araşdırmaları Simpoziumu zamanı türkdilli dövlətlərin bir sıra mühüm problemlərinə toxunulmuş və dünya türkoloqları həmrəylik nümayiş etdirmişlər.

Sonda hər il eyniadlı simpoziumun türkdilli dövlətlərin birində keçirilməsi qərara alınmışdır.

**Elnurə PAŞAYEVA,**
**"Türk araşdırmaları" elmi-tədqiqat laboratoriyasının əməkdaşı**







# Kuboku "Zirvə" qazandı

"Xəmsə" milli intellektual oyunu 7 ildir ki, Gənclər və İdman Nazirliyinin və "Gənclərin İntellektual İnkişafı Mərkəzi"nin dəstəyi ilə Faiq Hüseynovun rəhbərliyi altında fəaliyyət göstərir.Fəaliyyətə başladığı gündən gənclərin intellektual səviyyənin yüksəlməsinə xidmət göstərib.

"Xəmsə" milli intellektual oyunu 5 raund, 5 mövzu, 5 sual, 5 oyunçudan təşkil olunur. Oyun zamani ümumilikdə 100 sual səslənir.

Bu il mart ayının 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Kainat" Gənclik Mərkəzinin baş sponsurluğu, "Gənclərin İntellektual İnkişafı Mərkəzi"nin və Tələbə Həmkarlar İttifaqı Komitəsinin təşkilatçılığı ilə "Xəmsə" milli intellektual oyunu keçirildi. Oyunda müxtəlif fakültələrdən təşkil olunan 16 komanda mübarizə apardı. Hər qrupda 4 komanda olmaqla A, B, C, D qruplarina bölündü və hər qrupdan 1 komanda finala vəsiqə qazandı. Finalda isə gərgin mübarizədən sonra Filologiya fakültəsinin qızlardan ibarət "Zirvə" komandası kuboku qazandi.

İlk 3 yeri tutan komandalara diplom və hədiyyələr verildi. 1-ci yeri tutan komandaya və oyunda ən yaxşı oyunçu nominasiyasına layiq görülən Rüfət Əhmədova hədiyyələri Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri Vurğun Məmmədov özü təqdim etdi və tələbələrə uğurlar arzuladi.

Növbəti oyunlarımızın aprel və may aylarında keçirilməsi nəzərdə tutulur. "Xəmsə" milli intellektual oynunda iştirak etmək üçün Tələbə Həmkarlar İttifaqı Komitəsinin fakültə sədrlərinə və ya ADPU-da "Xəmsə" bilicisi olan Azad Manaflıya müraciət edə bilərsiniz.

**Azad MANAFLI,**
**Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin I kursunun 101-ci qrup tələbəsi**





# ADPU-da könüllü qanvermə aksiyası



Məlum olduğu kimi, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 2008-ci il aprel ayının 7-də imzaladığı 2749 saylı Sərəncama əsasən hər il mart ayının 10-u ölkəmizdə Azərbaycan Qızıl Aypara Cəmiyyətinin (AQAC) yaradıldığı gün kimi qeyd edilir. Bu il martın 10-da isə AQAC-ın yaradılmasının 94-cü ildönümü tamam olur. AQAC özünün bu yubileyi münasibətilə hazırda ölkəmizin şəhər və rayonlarında silsilə tədbirlər həyata keçirir. Məlumat üçün onu da qeyd edək ki, AQAC "İcmaya əsaslanan sağlamlıq" proqramı çərçivəsində hər il ölkəmizdə müxtəlif tədbirlər təşkil edir.

AQAC-ın fəaliyyətində səhiyyə sahəsi ilə bağlı reallaşdırdığı tədbirlər xüsusi yer tutur. Cəmiyyətin vərəm, talassemiya (qan azlığı), QİÇS (qapalı immun çatışmazlığı sindromu) və digər xəstəliklər əleyhinə keçirildiyi çoxsaylı tədbirlər ölkəmizdə səhiyyə maarifçiliyinin təşkili və təbliği baxımından mühüm əhəmiyyət kəsb edir. AQAC-ın Səhiyyə Nazirliyinin nümayəndələrinin iştirakı ilə talassemiyadan əziyyət çəkən insanlara kömək etmək məqsədilə keçirdiyi belə xeyirxah tədbirlərdən biri də mart ayının 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) gerçəkləşmişdir.





ADPU-da keçirilən könüllü qanvermə aksiyasında Cəmiyyətin prezidenti, Milli Məclisin deputatı Novruz Aslanov, Cəmiyyətin əməkdaşları, universitetin müəllim və tələbələri, həmçinin əməkdaşları fəal iştirak etmişlər.

Onu da qeyd edək ki, ADPU-da təhsil alan türkiyəli tələbələr də bu qanvermə aksiyasında fəal iştirak etmişlər. Bir gün davam edən qanvermə aksiyasında ADPU-nun 100-dən çox müəllim və tələbəsi iştirak etmişdir.

**Gülnar BƏXTİYARQIZI**

# Tələbəmiz layihə qalibidir

Orxan Əzizov Tarix fakültəsinin II kursunda təhsil alır. Azərbaycan Respublikasının Prezidenti yanında Gənclər Fondunun maliyyə, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) və Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) dəstəyi ilə həyata keçirilən "Əngəllər tanımayan ürəklər" layihəsində iştirak edib və layihənin qalibi olub.

Mart ayının 11-də universitetin tələbə-gənclərinin qatıldığı görüş bu mövzuda idi. Layihə çərçivəsində keçirilən tədbirə Paralimpiya çempionu, beşqat Avropa və ikiqat dünya çempionu, Əməkdar idman ustası, "Şöhrət" ordenli İlham Zəkiyev dəvət olunmuşdu. İştirakçılara layihə rəhbəri Orxan Əzizovun hazırladığı "Əngəl tanımayan ürəklər" adlı kitabça paylandı. Kitabçada fiziki cəhətdən qüsurlu olub adını qızıl hərflərlə tarixə yazan Əmir Teymur, Avraam Linkoln, Ruzvelt, Stefen V.Haurinq, Luis Brayl, Helen Keller, Lüdviq van Bethoven, Tomas Edisson, Kristi Braun haqqında qısa, lakin oxucunu məlumatlandıracaq dərəcədə informasiya verilir.

Tədbiri giriş sözü ilə açan Orxan Əzizov iştirakçılara layihə barədə məlumat vermiş, layihənin məqsədinin fiziki cəhətdən qüsurlu gənclərin fəal həyat tərzi sürməsini stimullaşdırmaq, onların həyatda fəal gənclər olmalarına yardım etmək olduğunu söyləmişdir.

Çıxışının sonunda O.Əzizov bu işdə ona dayaq olmuş Azərbaycan Respublikasının Prezidenti yanında Gənclər Fondunun rəhbərliyinə, ATGTİ-yə və universitet TGT-yə minnətdarlığını bildirmişdir.

Sonra fiziki cəhətdən qüsurlu olan, lakin həyat eşqi aşıb-daşan bir gəncin həyat hekayətindən bəhs edən videoçarx nümayiş etdirilmişdir.

Tədbirdə çıxış edən Gənclər Fondunun nümayəndəsi Vüsalə xanım fondun bugünədək 6 mindən artıq layihə həyata keçirdiyini, O.Əzizovun təqdim etdiyi layihənin bu sıradan biri olduğunu söyləmişdir. O, "elə insanlar vardır ki, sağlam olduqları halda dünyadan heç yaşamamış kimi ayrılırlar. Nə bir iz, nə bir əsər, nə də ki bir ad buraxırlar. Amma elə insanlar da var ki, əngəlli olmaqlarına baxmayaraq, adını qızıl hərflərlə tarixə yazırlar"-deyərək ADPU-nun tələbə-gənclərini də bu kimi layihələrə qoşulmağa səsləmişdir. Bilməlisiniz ki, - demişdir, - Gənclər Fondu, Gənclər Təşkilatları sizlərin fəaliyyətinə qiymət vermək üçündür.

Sonra çıxış edənlər - Paralimpiya çempionu, Qarabağ müharibəsində gözlərindən zədə almış İlham Zəkiyev, ADPU-nun "Gənclik" İctimai Birliyinin sədri Elman Süleymanov çıxışlarında fiziki cəhətdən qüsurlu olmalarına baxmayaraq, həyatda göstərdikləri mübarizlik əzmindən söz açmış, tələbələri maraqlandıran sualları cavablandırmışlar.

**A.İSGƏNDƏROV**

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Elmi katib **Laçın Həsənovaya** əzizi **Ədilə xanımın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri **Vurğun Məmmədova** əmisi oğlu **Elşən Əliyevin** vaxtsız vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi universitetin əməkdaşı **Əli Səmədova** qardaşı **İftixarın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fizikanın tədrisi metodikası kafedrasının dosenti **Nazim Mənsimovun** vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İngilis dili və onun tədrisi metodikası kafedrasının baş müəllimi **Jalə Bəşirovaya** nənəsi **Şəfiqə xanımın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi pedaqogika kafedrasının əməkdaşı **Nuridə Qasımovaya** anası **Bəyim xanımın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi-34, ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1269
Sayı: 1500
Çapa imzalanıb: 31.03.2014-cü il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompyuter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.